# Nitqin orijinallığı

Nitqin orijinallığı nitqdə özünəməxsusluqdur, bir şəxsin başqalarından fərqli danışması və yazmasıdır. Nitqin orijinallığı bir neçə cəhətdən özünü göstərir ki, bunlardan birincisi fərdi tələffüz tərzidir. Nitqin tələffüz baxımından fərqlənməsi, nəzərə çarpması aşağıdakı amillərlə daha çox bağlı olur:

1. Səslərin, sözlərin aydın diksiya ilə tələffüzü;

2. Söz və qrammatik formaların orfoepik qaydalar əsasında tələffüzü;

3. Bir qədər ucadan, aramla danışmaq və oxumaq;

4. Bir qədər astadan danışmaq, nitq fasilələrində daha münasib sözlər fikirləşib tapmaq və nitqini davam etdirmək;

5. Danışıq və xüsusən oxu prosesində intonasiya çalarlarından daha bacarıqla, məzmuna uyğun şəkildə istifadə edə bilmək;

6. Danışanın səciyyəvi söz, ifadə, sitat, sintaktik konstruksiyalar, frazeoloji ifadələr, aforizmlər, atalar sözü, zərb-məsəllər və s. işlətməsi, nitqin xüsusi tərzdə qurulması;

İctimai yerdə çıxış edən öz məqsədini aşkarlamaq, fikirlərini dinləyicilərə asan, aydın, ifadəli, həm də maraqlı bir şəkildə çatdıra bilmək üçün daha münasib, işlədilməmiş sözlərdən, ifadələrdən istifadə etməyə, cümlələr qurmağa çalışır. Bu orijinallıq nitqin qurulmasında daha çox nəzərə çarpır. Bəziləri nitqinə atalar sözü, zərbi-məsəl, ibrətamiz bir əhvalatla başlayır. Bir başqası nitqinin əvvəlində şərh ediləcək mövzu ilə bağlı bir parça şeir söyləyir. Digər natiqlər məşhur adamların, görkəmli yazıçı və şairlərin əsərlərindən, dövlət xadimlərinin çıxışlarındakı sərrast və parlaq ifadələrdən sitatlar gətirdikdən sonra məsələnin mahiyyətini şərh etməyə başlayırlar. Nitqə başlamağın digər formalarından da (məsələn, ritorik suallar qoymaq, mövzu ilə bağlı gözlənilməz və qəribə bir məzhəkə, lətifə danışmaqla əsl mətləbə keçmək və s.) natiqlik təcrübəsində səmərəli priyom kimi tətbiq edilir. Nitqin orijinallığını təmin edən vasitələrdən biri də **bədii təsvir vasitələridir**. Bədii təsvir vasitələrindən yerində, həm də uyarlı bir şəkildə istifadə nitqi təsirli, parlaq, obrazlı etməklə bərabər, ona orijinallıq da gətirir. Həmin vasitələrdən nitqdə istifadə bacarığına yiyələnmək üçün natiq müntəzəm olaraq bədii əsərləri mütaliə etməli, yazıçı və şairlərin dilindəki natiqlik sənəti baxımlından daha yararlı

və münasib söz və ifadələrə, digər təsvir vasitələrinə diqqət yetirməli, onlardan yeri gəldikcə istifadə etməyə çalışmalıdır. Volterin təbirincə desək, adamlar yaxşı yazıçıları mütaliə etdikcə yaxşı danışmağa vərdiş edirlər.

## Nitqin zənginliyi

Zəngin söz ehtiyatına malik natiq yalnız dilin incəliklərinə bələdlik nəticəsində öz nitqini rəngarəng qura bilir. Nitqin zənginliyinin başlıca amili onda dil vahidlərinin təkcə çoxluğu deyil, rəngarəngliyidir. Natiq öz fikirlərini daha münasib sözlərdən – sinonimlərdən, antonimlərdən, frazeoloji birləşmələrdən, ibarələrdən, məcazların müxtəlif növlərindən istifadə hesabına nitqini maraqlı qurur, onların asan dərk edilməsi ilə dinləyicilərə xoş təsir bağışlayır. Deməli, nitqin zənginliyi dilin ifadə və təsvir vasitələri hesabına başa gəlir. Nitqin zənginliyi dil strukturundan, xüsusən aktiv söz ehtiyatının kəmiyyət və keyfiyyətindən asılı olan məsələdir.

Nitqin zənginliyi bütün üslublar üçün vacib olsa da, bədii üslubda o daha yüksək, elmi və publisistik üslublarda nisbətən aşağıdır. Səbəbi də onunla izah edilir ki, bədii əsərlərdə yazıçının dilin bütün laylarında işlənən sözlərdən istifadə etmək hüququ var, amma elmi və publisistik üslublarda mövzu ilə əlaqədar sahə sözləri və terminlər çoxluq təşkil edir. Bədii əsərdə yazıçının söz ehtiyatı zəngin olduğu üçün o, hadisələri dəqiq, incə, ifadəli, obrazlı və orijinal üsulda ifadə imkanına malikdir. O, sözlərin leksik-semantik zənginliyindən tutmuş intonasiya və ritm incəliklərinə qədər bütün dil vasitələrinə müraciət etməkdə azaddır.

Nitqin zənginliyinin əsas əlaməti onda işlənən sözlərin təkrar olunmadan kəmiyyətcə çoxluğudur. Geniş dünyagörüşünə, mükəmməl savada, daimi mütaliəyə malik şəxsin söz ehtiyatı kəmiyyət və keyfiyyətcə çox zəngin olur. Söz sənətkarlarının - şair və yazıçıların bədii nitqinin zənginliyi məhz bu hesabadır. Biz tələbələrimizin zəngin nitq mədəniyyətinə nail olmasını, mədəni və savadlı şəxs kimi yetişməsini istəyiriksə, onlara ana dilimizdə radio-televiziya verilişlərini diqqətlə izləməyə, mütaliə etməyə maraq oyatmalı, müxtəlif vasitələrlə – disputlar, bədii gecələr, şair və yazıçılarla görüşlər keçirməklə, sözlərin, ifadələrin, cümlələrin ifadə tərzinə diqqəti yönəltməklə, nitqin məziyyətlərini mənimsətməklə onların söz ehtiyatını artırıb zənginləşdirməyə çalışmalıyıq. Bədii, elmi, kütləvi,

publisistik əsərlərin müntəzəm mütaliəsi gənclərimizin söz ehtiyatını artırmaqla onlar üçün ümumişlək olmayan, az işlətdikləri sözlərin də nitqdə aktivləşməsinə səbəb olacağı şübhəsizdir.

Müəyyən rabitəli mətndə nə qədər çox müxtəlif və təkrarlanmayan söz, ifadə və cümlə işlədilərsə, həmin nitq o qədər də zəngin olar, maraqla dinlənilər, yaxşı təsir bağışlayar, asan dərk olunar. Söz ehtiyatı zəngin olan, işlətdiyi hər söz və ifadənin mənasını yaxşı anlayan adam həmişə öz fikirlərini çətinlik çəkmədən sərbəst şəkildə ifadə edə bilir.

Hər bir savadlı və mədəni şəxs daima öz lüğət ehtiyatının artırılması qayğısına qalmalıdır. Bunun üçün ən səmərəli vasitə radio və televiziya verilişlərini dinləmək və mütaliəni genişləndirməkdir. Diktor, aktyor, söz ustaları, natiqlərin və başqalarının danışıqlarını müntəzəm olaraq dinləmək, sözlərin, ifadələrin, cümlələrin ifadə tərzinə diqqət yetirmək, nitqin bu baxımdan məziyyətlərini mənimsəmək yolu ilə lüğəti genişləndirmək və zənginləşdirmək olar. Lüğətin artırılması üçün digər və ən səmərəli yollardan biri də mütaliədir. Bədii, elmi-kütləvi, publisistik, fəlsəfi və s. əsərlərin müntəzəm şəkildə mütaliəsi söz ehtiyatının artırılmasına səbəb olur.

Nitqin zənginliyi və emosionallığını təmin edən amillərdən bir də **intonasiyadır**. Bu o deməkdir ki, söylənilən fikirlər, onlara münasibət insanın keçirdiyi hissi hallar uyğun səs tərtibatı, avazla verilə bilsin, nitq rəngarəng intonasiya çalarlarına malik olsun, danışan intonasiya elementlərindən (məntiqi vurğu, nitq fasiləsi, nitq tonu, səsin tembri və s.) düzgün istifadə etməyi bacarsın və s. Nitqin intonasiya baxımından zənginliyindən danışarkən sual, nida, əmr cümlələri, xitablar, ara sözlər, ara cümlələr və s. sintaktik quruluşların özünə-müvafiq formada, təbii şəkildə tələffüz olunmasının vacibliyi də diqqət mərkəzində saxlanılmalıdır.

Nitq zənginliyinin başlıca əlamətlərindən biri də onun **məzmun cəhətdən dolğunluğudur.** Nitq o zaman maraqla dinlənilir ki, haqqında bəhs olunan məsələ yeni olsun, həm də hərtərəfli şəkildə, sübutlarla, dəlillərlə, həyati misallarla, dinləyicini qane edəcək bir formada şərh edilsin. Nitqin zənginliyindən danışarkən bu keyfiyyəti yaradan digər vasitələri – dilin qrammatik və üslubi imkanlarından

səmərəli şəkildə istifadə olunması, danışanın intellektuallıq səviyyəsi, təfəkkürünün fəallığı və sairəni də nəzərə almaq lazımdır.